UOT668.652

# MODELLƏŞDİRMƏ VƏ QURAŞDIRMA ƏMƏLİYYATLARININ UŞAQ GEYİMLƏRİNİN İSTEHLAK XASSƏLƏRİNƏ TƏSİRİNİN EKSPERTİZASI

**F. N. MƏMMƏDOVA**
**Azərbaycan Dövlət İqtisad Universiteti (UNEC)**

*Məqalədə modelləşdirmə və quraşdırma əməliyyatlarının uşaq geyimlərinin istehlak xassələrinə təsirinin ekspertizasından, yeni modelin layihəsinin hazırlanması, onun etalonunun yaradılması, bu etalon üzrə uşaq geyimlərinin istehsalından ətraflı bəhs edilir, həmçinin uşaq geyimlərinin istehlak xassələrinin ekspertizası da ön plana çəkilir.*

*Məlum olduğu kimi,modelləşdirmə və quraşdırma əməliyyatları uşaq geyimlərinin istehlak xassələrini formalaşdıran əsas əməliyyatlar sırasına aid edilir.*

***Açar sözlər:*** *modelləşdirmə, quraşdırma, uşaq geyimləri, istehlak xassələri, ekspertiza, əməliyyatlar, əsas hissələr, aralıq hissələr, bəzək və furnitura materialları.*

Mp əqalədə modelləşdirmə və quraşdırma əməliyyatlarının uşaq geyimlərinin istehlak xassələrinə təsiri təhlil olunur. Uşaq geyimləri kütləvi, seriyalı və fərdi sifarişlər üzrə istehsal edilir. Paltarların iri qruplar üzrə külli miqdarda kütləvi və seriyalı istehsalı dövlət tikiş fabriklərində, yerli sənaye müəssisələrində və artellərdə aparılır. Kütləvi sürətdə eyni tipli tikiş məmulat istehsalı ixtisaslaşdırılmış iri dövlət tikiş fabriklərində başa çatdırlır. Belə fabriklər min və on minlərlə tikiş məmulatı buraxmaq imkanına malikdır [1].

Paltarların kütləri istehsalı müəyyən ardıcıllıqla, yəni,modelləşdirmə, quraşdırma, parçanın biçilməyə hazırlanması və biçilməsi, məmulatın tikilməsi, bəzək əməliyyatı vasitəsilə başa çadırılır.Birinci iki mərhələyə (modelləşdimə vəquraşdırma) paltarın layihələşdirilməsi daxildir.Layihələşdirmə prosesləri bütün sifariş edilmiş mal partiyası üçün bir dəfə aparılır. Yeni modelin layihəsi hazırlanır, onun etalonu yaradılır və bu etalon üzrə məmulat hazırlanır. Paltarların kütləvi istehsalı üçün insan fiqurlarının düzgün qruplaşdırılmasının əhəmiyyəti böyükdür. Burada ən çox rast gəlinən fiqur əsas götürülür.

Paltarların hazırlanması üçün tətbiq edilən materiallar təyinatından asılı olaraq əsas, aralıq və istisaxlayıcı hissələri birləşdirən, bəzək və furnitura materiallarına bölünür. Əsas materiallara üz materialları və astarlığı üçün olan yun, ipək, pambıq, kətan, toxunmamış materiallar, süni xəzlər, zamşa gönləri və s. daxildir. Son illərdə süni və sintetik materialların tətbiqi daha da genişlənmişdir. Paltarların istehsalında işlənən bərkidici-birləşdirici material kimi müxtəlif ipək, kapron, yun, pambıq saplar, müxtəlif yapışqanlar və s. işlədilir. Bəzək materiallarına sap, iplik, muncuqlar, şüşə lifləri, krujeva, tül, qaytan, lent, düymələr və s. aiddir. Furnituralara- düymələr, ilmələr, toqqalar, saplar, knopkalar və s. aiddir [2]. Parçanın rəngi, naxışıvə s. modelə uyğun gəlmədikdə modelçi öz məqsədinə tam nail ola bilmir. Parçanın xassələri nəzərə alınmadıqda məmulatı tikən zaman onu formaya salmaq çətinləşir və belə geyim öz formasını tez itirir. Geyimlərdə parçanın naxışları düzgün yerləşdirilmədikdə o, alıcıların xoşuna gəlmir.

*Modelləşdirmə əməliyyatı üç əsas mərhələyə bölünür:*modelin eskizini yaratmaq,model üçün parça və qeyri-materialları seçmək,eskiz üzrə model hazırlayıb kiçik və böyük bədii şurada modeli təsdiq etdirmək.

Yeni model əvvəl eskiz üzərində yaradılır. Lakin, modelçinin təcrübəsindən asılı olaraq bəzən model bilavasitə material üzərində, yəni mulyajlarla və yaxud modelin maketini sadə,yüngül parçadan tikmək vasitəsi ilə aparılır.Yeni modelləri təsdiq etmək və qəbul etmək üçün modalar evlərində iri fabriklərində kiçik və böyük şura yaradılır. Kiçik bədii şurada modelin eskizi və yaxud ilk nümünəsi yoxlanılır və təsdiq edilir. Böyük şurada yeni modellər nümayiş edilir və müzakirə olunur [1].

Hazır məmulatın keyfiyyətixeyli dərəcədə parçaların biçilməsindən asılıdır.Parçaların biçim əməliyyatları üçün istehsalın düzgün təşkilinin böyük əhəmiyyəti vardır.Biçim əməliyyatı tikiş sexini fasiləsiz olaraq, materialla təmin etməlidir. Parçanın rasional biçiminin təşkili vacib şərtlərdəndir. Parçanın rasional biçilməsi materialların sərfi ilə iqtisadi həyatdan xeyli qənaət etməyə imkan verir ki, bu da tikiş məmulatlarının maya dəyərinə təsir göstərir. Kütləvi istehsalda paltar, tikili məmulatın hazırlanmasına dair tipik metodika üzrə

biçilib-tikilir.Parlatrların hazırlanmasının tipik metodları DÖST – lərə, TNŞ – lərə və qabaqcıl tikiş fabriklərinin iş təcrübəsinə əsasən tərtib edilir [3].

Parçaların biçilməsi əməliyyatları iki mərhələdən – hazırlıq və əsas əməliyyatlardan ibarətdir. Biçim üçün bir sıra hazırlıq əməliyyatları aparılır. Hazırlıq əməliyyatlarına parça və başqa materialların qəbul edilməsi, dəstləşdirilməsi, sortlaşdırılması, parça kəsiklərinin hesablanması, üzərinə işarələrin qoyulması və s. daxildir [1].

Geyimlərin ən başlıca vəzifəsi insan orqanizmini xarici mühitin və mexaniki zədələnmələrin təsirindən qorumaqdan ibarətdir. Bu növ məmulatların yararlılıq qabiliyyətləri ilə yanaşı estetik funksiyasının da həlledici rolu vardır. Çünki o, insanı bəzəmə qabiliyyətinə də malikdir [1].

Digər növ mallarda olduğu kimi, geyim mallarının da istehlak dəyəri müxtəlif tələblərə cavab verən kompleks xassələrlə təyin edilir. İstehlakçı üçün lazımdır ki, geyim malları dözümlü, gigiyenik, rahat və gözəl olsun. Bununla bərabər, hazırki dövrdə müxtəlif növ materialların və təkmilləşdirilmiş texnoloji əməliyyatların tətbiqi sahəsində istehlakçının lazımi tələbatını ödəyə bilən geyim malları istehsal etmək mümkündür [2].

Geyim mallarına verilən bütün tələbləri şərti olaraq üç qrupa bölmək olar:

1. Estetik tələblər;
2. Gigiyenik tələblər;
3. Xidmət müddətini təyin edən istehlak tələbləri.

***Estetik tələblər.***İnsanın xarici görünüşünün müəyyən qaydada tərtib edilməsində əsas vəzifəni geyim məmulatları yerinə yetirir. Buna görə də, məmulatların bədii cəhətdən tərtib edilməsi çox vacib tələb sayılır.Geyim nəinki, özü-özlüyündə gözəl olmalıdır, eyni zamanda insanı da bəzəndirmə qabiliyyətinə malik olmalıdır. O növ geyim məmulatları yüksək estetik tələbatlara uyğun gələ bilər ki, onun modası müasir gözəllik qanunauyğunluqlarına və tamaşaçı baxışına cavab verə bilsin. Belə halda həmin məmulat insanlarda estetik hisslərin oyanmasına və ödənilməsinə səbəb ola bilər. Geyimlərin estetik tələblərinə təsir edən ən vacib amillərdən biri moda və stildir. Stil və yaxud üslub dedikdə müəyyən dövrün incəsənəti üçün səciyyəvi olan obrazlı sistemin ümumiliyi, bədii ifadə vasitələri başa düşülür[2].

***Gigiyenik tələblər.*** Geyimlərə verilən gigiyenik tələblərin əsas vəzifəsi ondan ibarətdir ki, onlar insanın normal həyat fəaliyyətini təmin etmiş olsun. Geyimlərin gigiyenik tələblərini 2 əsas qrupa bölmək olar: İnsan bədənini xarici mühitin xoşagəlməz amillərindən qoruya bilməsi və orqanizmin normal funksiyasını təmin etmək üçün lazımi şəraitin yaradılması [1].

Geyimlərin gigiyenikliyinin əlverişli olmasında onun çəkisinin və yumşaqlığının xüsusi rolu var. Bütün geyim dəstinin çəkisi bədənin çəkisinin 15% -ə qədərini təşkil etməlidir. Geyimlərin gigiyenik xassəsinin lazımi tələb göstəricilərinə uyğun gəlməsində çirklənmənin və elektrikləşmənin də xüsusi rolu vardır. Hamar səthli material tozu az götürür, lakin xovlu və mürəkkəb tikiş sırıqlarına malik məmulat nisbətən çox toz götürə bilər. Sintetik və süni liflərin bəziləri yüksək elektrikləşmə xassəsinə malik olduğundan, bu növ materiallardan olan geyimlər istehlak zamanı asanlıqla çirklənirlər [1].

***Xidmət müddətini təyin edən istehlak tələbləri.*** Geyimlərə qoyulan ən vacib tələblərdən biri də onun istismar müddətinin uzun olması və yaxud xidmətinin daha çox olmasıdır.Geyimlərin xidmət müddəti dedikdə, məmulatın dağılana qədər tətbiq müddəti başa düşülür ki,bunu da saatlarla, günlərlə, aylar və illərlə hesablayırlar. Geyimin xidmət müddətinin qurtarması istər məmulatın tamdağılması ilə və yaxud xassələrinin pisləşməsi, modasının dəyişməsi, istehlakçının boy və ölçüsünün dəyişməsi ilə başa çata bilər [2].

Geyimlərin xidmət müddətinin iqtisadi amillərdən də asılılığı vardır.Geyimlərin ucuz və bahalığı ölkənin iqtisadi inkişafının ümumi səviyyəsi ilə, sənayenin vəziyyəti ilə, tikiş sənayesinin texnlogiyasının müasirliyi və təşkili ilə, habelə digər işlərin obyektiv iqtisadi amilləri ilə təyin olunur [1].

**ƏDƏBİYYAT**

**1.** Həsənov. Ə. P., Nuriyev. D. Ə., Vəlıməmmədov. C. M., Həsənov. N. N., Osmanov. T. R., Babayev. M. A., Səmədov. E. Ə. Qeyri- ərzaq mallarının ekspertizası. Bakı, 2006. **2.** Həsənov. Ə. P ., Nuriyev. D. Ə., Vəlıməmmədov. C. M., Həsənov. N. N., Osmanov. T. R., Babayev. M. A., Səmədov. E. Ə. İstehlak mallarının estetikası. Bakı, 2014. **3**. Uşaq geyimlərinin keyfiyyətini tənzimləyən normativ texniki sənədlər, 2015.

**Влияние экспертизы потребительских свойств на процессы моделирования и конструирования детской одежды**

**Ф.Н.Мамедова**

В статье подробно рассказывается о влиянии экспертизы на моделирование и конструирование потребительских свойств детской одежды,об изготовлении проектирования новых моделей, о создании его эталона.Подробно рассказывается о производстве детской одежды на основании данного эталона, а также на первый план выдвигается экспертиза свойств потребительских товаров.

Как известно, операции моделирования и конструирования являются одними из основных операций, формирующих потребительские свойства детской одежды.

***Ключевые слова:*** моделирование, конструирование, детская одежда, потребительские свойства, экспертиза, операции, основные материалы, прикладные материалы, отделочные материалы и фурнитура.

**Examination of impact of modeling and construction operations on children's wear consumption properties**

**F.N.Mammadova**

The article broadly discusses examination of impact of modeling and construction operations on children's wear consumption properties, development of new modeling project, its standard creation and children's wear manufacturing based on that standard. Expertise of consumption properties of children's wear is also highlighted.

As known, modeling and construction operations are one of the main operations that form consumption properties of children's wear.

***Keywords**:* modeling, construction, children's wear, consumption property, expertise, operations, main materials, sub-materials, trims and accessories.

